AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 4 (270), 45-54
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.004

A Z Ə R B A Y C A N D İ L İ : Q R A M M A T İ K A

# Müasir Azərbaycan dilində omonimlərin tipləri

***Elşad Abışov***
Filologiya üzrə fəlsəfə doktoru, dosent. Müasir Azərbaycan dili kafedrası, ADPU. Azərbaycan. E-mail: elsad_abisov@mail.ru
https://orcid.org/0000-0002-5048-1872

**XÜLASƏ**
Məqalədə müasir Azərbaycan ədəbi dilində fikrin obrazlılığının, ifadəliliyinin təmin edilməsində müstəsna əhəmiyyətə malik olan təsadüfi omonimlər və onların spesifik xüsusiyyətləri linqvistik istiqamətdə tədqiqata cəlb edilir. Araşdırma prosesində təsadüfi omonimlərin və onların tiplərinin təsnifatı probleminə mövcud elmi-nəzəri mülahizələr əsasında aydınlıq gətirilir. Linqvistik müşahidələrdən məlum olur ki, omonimlərin tipləri sırasına omofon, omoform, omoqraf, leksik omonimlərlə yanaşı, leksik-qrammatik və qrammatik omonimlər də daxil edilməlidir. Dünya dillərində, o cümlədən Azərbaycan dilində omonimləşmə hadisəsi qədim tarixə malikdir.

**AÇAR SÖZLƏR**
omofon, omoform, omoqraf, omonim, semantika

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 15.11.2021
qəbul edilib: 22.11.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Filologiya elmləri doktoru, professor İsmayıl Kazımov.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 4, VOL. 270, 45-54
https://dx.doi.org/10.48445/TAIIJ.2021.46.47.004

**AZERBAIJANI LANGUAGE: GRAMMAR**

# Types of homonyms in the modern Azerbaijani language

***Elshad Abishov***
Doctor of Philosophy in Philology, Associate Professor. Department of modern Azerbaijani language, ASPU. Azerbaijan.
E-mail: elsad_abisov@mail.ru
https://orcid.org/0000-0002-5048-1872

**ABSTRACT**
The accidental homonyms and their specific features having exceptional importance during the providing of figurativeness, expressiveness of thought in the modern Azerbaijani literary language are attracted to the research linguistically in the article. The accidental homonyms, in other words, the issues of classification of the types of homonyms are clarified on the basis of the existed scientific-theoretical views in the process of research. It is known from the linguistic survey that, the lexical-grammatical homonyms and grammatical ho-monyms must be also included to the order of types of homonyms besides with the homophone, homoform, homograph and lexical homonyms.

**KEYWORDS**
homophone,
homoform,
homograph,
homonym, semantic

**ARTICLE HISTORY**
Received: 15.11.2021
Accepted: 22.11.2021

## Giriş / Introduction

Mənbələrdə omonimləşmənin Azərbaycan dili ilə yanaşı, türk dillərində də əski çağlarda güclü olduğu, yəni omonimlərin sayının üstünlük təşkil etdiyi qeyd olunur [6, s.160]. Bu isə, bədii təfəkkürün məhsulu kimi təzahür edən omonim sözlərin, fikrin daha obrazlı, təsirli və emosional ifadəsindəki rolu, həmçinin bədii nitqdə cinas yaratması ilə bağlıdır. Məsələn:

Könül, sən ki düşdün eşqin bəhrinə,
*Narın* çalxan, *narın* silkin, *narın üz.*
Dost səni bağına bağban eyləsə,
Almasın dər, gülün iylə, *narın üz*
[Aşıq Ələsgər].

Şeir parçasında verilmiş məcazi mənalı narın (incə, ehtiyatlı) sözü meyvə anlayışını bildirən nar (-ı[4] mənsubiyyət şəkilçisi, -n bitişdirici samitdir, təsirlik halın şəkilçisi isə ixtisar olunub) sözü ilə leksik-qrammatik, üz (suda üzmək) feili isə, özündən sonra gələn və onunla fərqli mənaya malik olan üz (qoparmaq) sözü ilə leksik-semantik omonimlik əmələ gətirmişdir.

Omonimləşmə hadisəsi dilə ağırlıq verdiyi üçün müasir dövrə doğru omonim sözlərin sayı xeyli azalmışdır. Lakin buna baxmayaraq, omonimlər və onların tipləri bədii dildə, xüsusilə poeziyada üslubi rəng yaratmaq imkanlarına malik olduqları üçün Azərbaycan ədəbi dilində indi də geniş istifadə olunur.

Omonimlərlə ümumi formaya malik olan və bu səbəbdən də omonim tipləri adlandırılan söz qrupları (bəzən bunları təsadüfi omonimlər də adlandırırlar) ilə bağlı mənbələrdə müxtəlif məlumatlara rast gəlinir.

Prof. A.M.Qurbanov bu barədə yazır: “Sözlərin eyni şəkildə səslənməsi hadisəsi hər dilin öz qanunları əsasında fonetik, morfoloji və leksik cəhətlə əlaqədardır. Buna görə də omonimlərin təxminən aşağıdakı tipləri mövcuddur: fonetik omonimlər, yəni omofonlar, morfoloji omonimlər, yəni omoformlar və leksik omonimlər, yəni xüsusi omonimlər” [3, s.328]. Prof. S.Cəfərov bu qrupa leksik-qrammatik omonimləri də daxil etmişdir [1, s.26].

Omonimlərin tipləri içərisində maraq doğuran söz qruplarından biri də omoqraflardır. Omoqraflar yazılışı eyni, səslənməsi müxtəlif olan sözlərin qarşılaşdırılması ilə yaranır, başqa sözlə, *müxtəlif şəkildə tələffüz olunub, eyni formada yazılan sözlərə omoqraf deyilir*. Məsələn:

Sürüdən ayırıb tez əlli *qoyun,*
Dedi ki, bunları yol üstə *qoyun*
[S.Ə.Şirvani].

Prof. H.Həsənov omoqrafların bu xüsusiyyətini əsas götürərək, onların fonetik tərkibcə və qrammatik cəhətdən omonimlərdən fərqləndiyini və buna görə də qrafik omonimlər kimi şərh edildiyini bildirir [7, s.54]. O, daha sonra yazır ki, omoqraflar bir-biri ilə qarşılaşdırıldıqda adama elə gəlir ki, onlar həm yazılış, həm də forma cəhətdən bir-birinin eynidir. Əslində isə, bunlar müxtəlif vurğulu sözlər olub, tələffüzcə fərqlənir. Məsələn: *alma`- a`lma, əki`n - ə`kin* və s. [7, s.54]. Göründüyü kimi dilçi-alim omoqrafları qrafik omonimlər adlandırsa da, onların omonimlərin digər tiplərindən (omofon və omoformlardan) vurğuya görə fərqləndiyini göstərir.

Prof. A.M.Qurbanov da omoqrafların omonimlərin digər tiplərindən vurğunun köməyi ilə fərqləndiyini diqqətə çatdırır [3, s.329]. Lakin o, H.Həsənovdan fərqli olaraq, omoqrafları morfoloji omonimlərlə, yəni omoformlarla əlaqəli şəkildə izah edir. Tədqiqatçı bununla bağlı yazır: "Müasir Azərbaycan ədəbi dilində bəzi sözlər bu və ya digər qrammatik formaya düşəndə, eyni zamanda həm omoform, həm də omoqraf olur". Məsələn:

*Alma`* budağından alça tökülməz
[Atalar sözü].

Evini, malını yadına salma,
Xan izn versə də, boynuna *a`lma*
[M.V.Vidadi].

Alim nümunələr üzərində fikrini belə şərh edir: "Alma sözü isimdir, meyvə anlayışını bildirir və vurğusu ikinci hecanın üzərinə düşür. İkinci nümunədəki alma sözü feildir (almaq), vurğusu birinci hecanın (al-ın) üzərinə düşür. "Al" feili ikinci şəxsin təki, əmr formasında işlənərkən alma ismi ilə omoform, vurğuya görə isə omoqraf əmələ gətirir" [3, s.329]. Məsələnin bu şəkildə qoyuluşu dildə fərqli fonosemantik hadisə kimi çıxış edən omoqraf və omoformların mahiyyətcə eyniləşdirilməsi deməkdir ki, bu da öz növbəsində onların sərhəddinin qarışdırılmasına və fikir dolaşıqlığına yol açır. Fikrimizcə, bəzi dərsliklərdə omoformların məzmunca omoqraflarla eyniləşdirilməsi və hər iki dil hadisəsinin morfoloji omonimlərə daxil edilməsi faktı məhz buradan qaynaqlanır. Bu yanlışlıq omoformlara verilən tərifdə daha aydın şəkildə müşahidə olunur. "Morfoloji omonimlər, yəni omoform və omoqraflar yazılışı və forması eyni olan müxtəlif vurğulu sözlərdir" [5, s.168].

Problemin mahiyyətini aydınlaşdırmaq və fikir dolaşıqlığını aradan qaldırmaq üçün hər iki anlayışın (omoform və omoqrafların) dildə ifadə etdiyi mənanı ayrı-ayrılıqda nəzərdən keçirmək lazım gəlir. Bu baxımdan, S.Cəfərovun nəzəri mülahizələri məzmunca daha dolğun və anlaşılandır. O, omoqrafların yalnız yazılışı eyni, səslənməsi müxtəlif olan leksik vahidlərin qarşılaşdırılması, omoformların isə sözlərin müxtəlif qrammatik şəkilləri ilə uyğunlaşması yolu ilə yarandığını qeyd edir [1, s.24-25].

Deməli, omoformların əmələ gəlməsində yalnız morfoloji əlamətlər (şəkilçilər) iştirak etdiyi halda, omoqrafların yaranmasında söz kökləri və şəkilçilərlə yanaşı, vurğu da həlledici rol oynayır, onu tələffüzcə morfoloji omonimlərdən (omoformlardan) fərqləndirir. Nəticədə, omoqraflar (omoformlardan fərqli olaraq) dildə morfoloji yox, fonomorfoloji və fonoleksik hadisə kimi özünü göstərir. Omoqrafları funksiyasına uyğun olaraq, bu şəkildə izah etmək olar: *Dildə vurğuya görə fərqlənən söz və ya söz formalara omoqraflar deyilir*. Məsələn: akademi`k-a`kademik, şaxt`a-şa`xta, dimdi`k-di`mdik və s.

Omoformlar bir çox hallarda məzmun etibarı ilə təkcə omoqraflarla deyil, leksik-qrammatik omonimlərlə də eyniləşdirilir, hətta fərqləndirilmədən morfoloji omonimlər kimi leksik-qrammatik omonimlər də omoformlar adı altında sistemləşdirilir. Analoji hadisəyə son dövrlərdə Azərbaycan dilçiliyi ilə bağlı yazılmış əksər dərslik və dərs vəsaitlərində təsadüf olunur. Belə mülahizələrdən birində deyilir: *“Əsgər çoxlu yara almışdır”* və *“Sözümü yara çatdır”* cümlələrindəki “yara” sözləri köklərinə görə fərqlənir. Birinci cümlədəki “yara” sözü başlanğıc formada, ikinci cümlədəki “yara” sözünün kökü isə “yar” ismidir (-a qrammatik şəkilçidir). Qrammatik şəkilçinin köməyi ilə aralarında bu cür oxşarlıq yaranan sözlər omoform adlanır [4, s.20].

Verilmiş cümlələrdəki “*yara*” və “*yar-a*” sözlərinin izahı doğrudur, lakin dildə bu qayda ilə əmələ gələn təsadüfi omonimlik omoform yox, leksik-qrammatik omonimlik hesab olunur.

Omoformların semantikası və formalaşma xüsusiyyətləri göstərir ki, onları leksik-qrammatik omonimlərlə eyniləşdirmək olmaz. Yuxarıda qeyd edildiyi kimi omoformlar morfoloji əlamətlərin (qrammatik şəkilçilərin) köməyi ilə yaranır. Məsələn:

Can evinə sığışmayan *arzular,*
Bu dünyada neçə dünya *arzular*
[S.Vurğun].

Bəndin 1-ci misrasındakı "arzular" sözü isim (arzu) olub, cəm şəkilçisi -lar[2], 2-ci misradakı "arzular" sözü isə feil (arzula) olub, kökünə III şəxsin təkinə qeyri-qəti gələcək zaman şəkilçisi əlavə edilməklə, qrammatik şəkilçilər hesabına omoform əmələ gətirmişdir.

Nümunələrdən də aydın olur ki, omoformlar yalnız qrammatik şəkilçilərin iştirakı ilə yaranır (arzu-lar, arzula-r). Sözün kök və ya əsasının omonimliyinin onlarla (omoformlarla) hər hansı əlaqəsi yoxdur.

Mövcud nəzəri-linqvistik mülahizələrə əsasən başlanğıc formada olan sözlərlə (söz əsası ilə) qrammatik şəkilçili leksik vahidlərin omonimliyi leksik-qrammatik omonimlərə aid edilir. Leksik-qrammatik omonimlərin səciyyəvi cəhəti odur ki, qarşılaşdırılan sözlərdən biri leksik, nominativ mənasını saxlayır, ikincisi isə qrammatik dəyişmə nəticəsində öz qarşılığına omonim hüququ qazanır [1, s.26]. Məsələn:

Dağdan yel *əsir* yenə,
Səbrimi kəsir yenə.
Gəldin məni eylədin,
Yolunda *əsir* yenə.

Bayatının 1-ci misrasındakı "əs" feili indiki zaman -ır[4] şəkilçisi qəbul edərək, 4-cü misradakı "əsir" ismi ilə omonim (leksik-qrammatik) olmuşdur.

Omonimlərin tipləri ilə bağlı mübahisə doğuran məqamlardan biri də müstəqil mənalı sözlərin (əsas nitq hissələrinin) köməkçi sözlərlə (köməkçi nitq hissələri ilə) uyğunlaşması əsasında yaranan omonimliyin leksik omonimlərə daxil edilməsidir.

Nəzərə almaq lazımdır ki, dildə mövcud olan digər söz qruplarında olduğu kimi, omonimlərin təsnifatında da elmi-məntiqi qanunauyğunluq gözlənilməlidir. Bu qanunauyğunluğa əsasən deyə bilərik ki, leksik omonimlik həqiqi və ya əsl omonimlikdir, onun əmələ gəlməsində iştirak edən leksik vahidlərin müstəqil lüğəvi mənaya malik olması mütləqdir. Məsələn:

Ovçu gəlib saldı hər yana nəzər,
Gördü tor yarılıb, yox ovdan *əsər*
[Q.Zakir].
Kasıb komacığım özümə yetər,
Burda yazılmışdır yüzlərlə *əsər*
[S.Vurğun].

Birinci bənddə verilmiş əsər (nişan, iz mənasında) vahidi ilə ikinci bənddəki əsər (yaradıcılıq mənasında) sözü eyni yazılışa, səslənməyə və fərqli lüğəvi mənaya malik müstəqil sözlər olduqları üçün leksik-semantik omonimlik təşkil edirlər.

Lüğəvi mənadan məhrum olan köməkçi sözlər (köməkçi nitq hissələri) isə ancaq qrammatik məna daşıdıqları üçün onların müstəqil sözlərlə (əsas nitq hissələri ilə) uyğunlaşmasından yaranan omonimliyin leksik omonimlərə daxil edilməsi özünü doğrultmur. Əsas və köməkçi sözlərin omonimliyinin qrammatik omonimlərə aid edilməsi hallarına da rast gəlinir [2, s.69].

Mülahizənin nə dərəcədə əsaslı olduğunu aydınlaşdırmaq üçün öncə qrammatik omonimlərin məzmun və xarakteri aydınlaşdırılmalıdır. "Bu tip omonimlərin də deyilişi və yazılışı eyni olur, lakin mənalarından biri əsas nitq hissəsinə, digəri köməkçi nitq hissəsinə və yaxud hər iki məna köməkçi nitq hissəsinə aid olur. Məsələn: *kimi* (əvəzlik, qoşma), *ilə* (bağlayıcı, qoşma), *yəni* (ədat, bağlayıcı)" [1, s.27].

Əsas nitq hissələrinin qrammatik omonimlər adı altında qruplaşdırılması onların təyinatının nəzəri cəhətdən qüsurlu olduğunu göstərir, çünki sözlərin nitq hissələrinə qədərki leksik funksiyaları və omonimliyini şərtləndirən leksik məna leksikologiyanın əsas məzmun xəttini təşkil edir. Müstəqil mənalı leksik vahidlərdən ibarət olan əsas nitq hissələrinin omonimliyi də qrammatik deyil, məhz leksik zəmində baş verən semantik hadisə olduğundan, sözün tam mənasında yuxarıda qeyd edildiyi kimi leksik omonimlik hesab olunur.

Bu fakt deməyə əsas verir ki, qrammatik omonimlik ancaq köməkçi sözlər (köməkçi nitq hissələri) və şəkilçilər arasında baş verən dil hadisəsidir. Bunu nəzərə alaraq, qrammatik omonimlərə belə bir tərif vermək olar: *Köməkçi morfemlərin qarşılaşdırılması ilə yaranan omonimlərə qrammatik omonimlər deyilir*. Məsələn: *ki* (ədat, bağlayıcı), *ilə* (qoşma, bağlayıcı), *-ın*$^{4}$ (hal və mənsubiyyət şəkilçisi), *-lı*$^{4}$ (isim və sifət düzəldən şəkilçi) və s.

Leksik və qrammatik omonimlərin səciyyəli xüsusiyyətləri ilə bağlı qanunauyğunluqlardan, həmçinin dil materialları üzərində aparılan müqayisə və təhlillərdən aydın olur ki, əsas və köməkçi nitq hissələrinin qarşılaşdırılması ilə yaranan omonimliyin istər leksik, istərsə də qrammatik omonimliyə daxil edilməsi nəzəri cəhətdən qüsurludur. Bu da, nəticə etibarilə, omonimlərin tipləri üzrə təsnifata yenidən nəzər salmağın zəruriliyini göstərir.

Sözlər omonimlərin tipləri üzrə qruplaşdırılarkən, omonimliyi şərtləndirən spesifik xüsusiyyətlər nəzərə alınmaqla, onu formalaşdıran hər bir leksik vahidin leksik, semantik, qrammatik mənası aydınlaşdırılmalı, tərkibində iştirak edən şəkilçinin (əgər iştirak edirsə) omonimyaratma imkanlarına diqqət yetirilməlidir.

Əsas və köməkçi nitq hissələrinin leksik-semantik xüsusiyyətlərinin bu əsasda təhlili göstərir ki, onların qarşılıqlı iştirakı ilə formalaşan omonimlik leksik-qrammatik omonimlikdir. Ona görə ki, bu tip omonimliyi əmələ gətirən tərəflərdən biri müstəqil leksik məna daşımaqla leksikologiyanın, digəri ancaq qrammatik məna kəsb etməklə qrammatikanın obyektini təşkil edir.

Bu məntiqi qanunauyğunluq, yəni leksik-qrammatik omonimlərin spesifikasının doğurduğu səciyyəvi xüsusiyyətlər ona verilən tərifdə də öz əksini tapmalıdır. Həmin xüsusiyyətlərin əsasında leksik-qrammatik omonimlərə verilən tərifi bu şəkildə səciyyələndirmək olar: *Kök və ya əsasdan (başlanğıc formadan) ibarət olan müstəqil mənalı sözlərin qrammatik şəkilçili leksik vahidlər və köməkçi sözlərlə (köməkçi nitq hissələri ilə) qarşılaşdırılması ilə yaranan omonimlərə leksik-qrammatik omonimlər deyilir*. Leksik-qrammatik omonimlər dildə iki formada özünü göstərir. Bunlardan biri leksik nominativ vahidlə qrammatik şəkilçili sözün qarşılaşması ilə yaranır. Məsələn:

Əzizinəm *gündə* mən,
Kölgədə sən, *gündə* mən.
İldə qurban bir olar,
Sənə qurban *gündə* mən.

Bayatının 1-ci misrasındakı “gün” ismi, yerlik hal şəkilçisi (də) qəbul edərək, 4-cü misradakı “gündə” (hər gün) zərfi ilə omonim olmuşdur. İkincisi isə, əsas və köməkçi nitq hissələrinin uyğunlaşması əsasında baş verir: Məsələn: isim-ədat omonimliyi: *azı* dişi ağzındadır – isim; *azı* üç saata gələr – ədat. İsim nida omonimliyi: *Ay* Yerin peykidir – isim; *Ay*, deyiləm ki mən özgəsi – nida və s.

Beləliklə, dildə fonosemantik hadisə kimi özünü göstərən omonimləri fonetik, leksik-semantik və morfoloji xüsusiyyətlərinə uyğun olaraq, verilən tiplər üzrə qruplaşdırmaq olar. Bu qruplaşma aşağıdakı cədvəldə də əks edilmişdir:

- Fonetik omonimlər, yəni omofonlar;
- Morfoloji omonimlər, yəni omoformlar;
- Leksik-semantik omonimlər, yəni həqiqi omonimlər;
- Fonoleksik və ya fonomorfoloji omonimlər, yəni omoqraflar;
- Leksik-qrammatik omonimlər;
- Qrammatik omonimlər.


Omo-
nim-
lərin
tipləri
Fonetik omonimlər, yəni omofonlar
Yalnız səslənməsinə görə omonim olan sözlər
1. Yaranar-yaranar
2. İnci mənəm-inci mənəm
Morfoloji omonimlər, yəni omoformlar
Qrammatik şəkilçilərin Iştirakı ilə yaranan omonimlər
1. Arzular-arzular
2. Atan - atan
Fonoleksik və ya fonomorfoloji omonimlər, yəni omoqraflar
Yazılışı eyni, səslənməsi müxtəlif olan omonimlər
1. Bağla`ma-bağlama`
2. Qoyu`n-qo`yun
Leksik-semantik omonimlər, yəni həqiqi omonimlər
Deyilişi və yazılışı eyni, mənaları müxtəlif olan omonimlər
1. Bir-bir
2. Tər-tər
Leksik-qrammatik omonilmlər
Müstəqil mənalı sozlərin qrammatik şəkilçili sözlər və köməkçi sözlərlə qarşılaşdırılması ilə yaranan omonimlər
Müstəqil mənalı sözlərlə qrammatik şəkilçili sözlərin omonimliyi
1. Əsir-əsir
2. Gündə-gündə
Əsas və köməkçi nitq hissələrinin omonimliyi
1. Azı-azı
2. Qabaq-qabaq
Qrammatik omonimlər
Köməkçi nitq hissələri və şəkilçilərin uyğunluğu ilə yaranan omonimlər
1. İlə-ilə
2. Ki-ki

## Nəticə / Conclusion

Məqalədə omonimlərin tipləri ilə bağlı elmi ədəbiyyatlarda əks olunan mülahizələr nəzərdən keçirilir, Azərbaycan dilində təsadüfi omonim kimi işlənən dil vahidlərinin elmi faktlar və dil materiallarına əsaslanan yeni təsnifatı təqdim edilir. Araşdırmada, həmçinin leksik-qrammatik omonimlərlə omoformların, habelə omoformlarla omoqrafların, leksik omonimlərlə qrammatik omonimlərin sərhəddi məsələsinə də geniş linqvistik tədqiqatlar əsasında aydınlıq gətirilir.

## İstifadə edilmiş ədəbiyyat / References


1. Cəfərov S. (2007). Müasir Azərbaycan dili (Leksika). Bakı, Şərq-Qərb. 192 s.
2. Qurbanov A.M. (1989). Ümumi dilçilik, I cild. Bakı, Maarif. 568 s.
3. Qurbanov A.M. (2003). Müasir Azərbaycan ədəbi dili, I cild. Bakı, Nurlan. 450 s.
4. Nağısoylu M., Zeynallı M., Hüseynov S. (2013). Azərbaycan dili (Abituriyentlər üçün dərs vəsaiti). Bakı, 271 s.
5. Xəlilov B. (2008). Müasir Azərbaycan dilinin leksikologiyası. Bakı, Nurlan. 442 s.
6. Xəlilov B. (2013). Müasir Azərbaycan dili (Fonetika). Bakı, Bakı Çap Evi nəşriyyatı. 317 s.
7. Həsənov H. (1980). Müasir Azərbaycan dilinin leksikası. Bakı, 308 s.
8. Manafov E. (2019). Azərbaycan dili (Abituriyentlər üçün dərs vəsaiti). Bakı, Güvən nəşriyyatı. 319 s.